# ALLAHSIZ HƏYATDAKI ABSURDLUQ

William Lane Craig

Nə üçün ateist həyatın mənası, dəyəri və ya məqsədi yoxdur və nə üçün bu dünya görüşü həyat üçün yararsızdır?

## Allahın zəruriliyi və əbədilik

Loren Eiseley[1] yazır ki, insan kosmik yetimdir. O, kainatda "nə üçün?" sualını verən yeganə məxluqdur. Digər heyvanlar onlara həyatlarında yol göstərəcək instinktlərə sahibdirlər, insan isə sual verməyi öyrənib. "Mən kiməm?" deyərək insan soruşur. "Mən nə üçün buradayam?" "Mənim mənzilim haradır?" Maarifçilik dövründən sonra, dinin zəncirlərini qırıb atdıqdan bəri insan bu suallara Allaha bağlanmadan cavab verməyə çalışıb. Amma geri aldığı cavablar heç də həvəsləndirici olmayıb, əksinə qaranlıq və dəhşətli idi: "Sən təbiətin təsadüfi olaraq törətdiyi əlavə məhsulsan, "maddə + vaxt + təsadüfün" nəticəsisən. Sənin mövcud olmağın üçün bir səbəb yoxdur. Üzləşdiyin şey sadəcə olaraq ölümdür."

Müasir insan Allahdan qurtulduqdan sonra ona basqı göstərən, onu boğan hər bir şeydən özünü qurtardığını düşünürdü. Əvəzində o kəşf etdi ki, o, Allahı "öldürməklə" özünü də öldürmüşdür. Çünki əgər Allah yoxdursa insanın həyatı absurd bir şey olur.

Əgər Allah mövcud deyilsə o zaman həm insan, həm də kainat qaçılmaz olaraq ölümə məhkumdur. İnsan da digər bioloji orqanizmlər kimi mütləq ölməlidir. Ölümsüzlüyə/əbədiliyə heç bir ümid olmadan insan həyatı, onu sadəcə qəbirə tərəf aparır. Onun həyatı sonsuz qaranlıqda əmələ gələn qığılcımdan başqa bir şey deyildir; əmələ gələn, parıldayan və sonra əbədi olaraq sönən bir qığılcım. Ona görə də teoloq Paul Tillich'in[2] "olmamazlıq təhlükəsi" adlandırdığı ilə hər bir kəs mütləq üz-üzə gəlməlidir. Çünki indi mövcud olduğumu, diri olduğumu bilsəm də həmçinin bilirəm ki, nə vaxtsa mən artıq mövcud olmayacam. Bilirəm ki, mən artıq olmayacam. Bilirəm ki, mən öləcəm. Bu fikir – yəni "özüm"

---

[1] Loren Eiseley (1907-1977) amerikalı antropoloq, filosof idi. 1950-ci və 1970-ci illər arasında fəlsəfə, təbiət elmləri, insanın mahiyyəti haqqında bir çox kitab yazıb. (tərc.)

[2] Paul Johannes Tillich (1886-1965) alman-amerikalı xristian eqzistensialist filosofdur, lüteran cərəyanına mənsub bir teoloqdur. İyirminci əsrin ən görkəmli teoloqlarından hesab edilir. Berlin, Halle və Breslau kimi alman şəhərlərində təhsil alıb. 1933-cü ildə faşist almanlar tərəfindən yandırılan kitablar arasında onun "Die Sozialistische Entscheidung" adlı kitabı da var idi. Tillich eqzistensialist fəlsəfənin teist qolunu təmsil edir, lakin ən məşhur eqzistensialist filosofların əksəriyyəti ateist olublar. (tərc.)

adlandırdığım şəxsin mövcudiyyətinin sona varacağını, mənim artıq olmayacağımı fikirləşmək - son dərəcə sarsıdıcı və hədələyicidir.

Atamın mənə nə zamansa öləcəyimi ilk dəfə söylədiyi anı qabarıq şəkildə xatırlayıram. Birnöv uşaq olduğum üçün bu fikir heç vaxt ağlıma gəlməmişdi. Ancaq o bunu mənə dedikdə mənim içimə qorxu və dözülməz kədər doldu. Bunun baş verməsinə hələ çox uzun müddət qaldığına məni təkrar-təkrar arxayın etməyə çalışsa da artıq heç bir əhəmiyyət kəsb etmirdi. Tez və gec olması heç bir fərq etmirdi, mənim öləcəyim və artıq mövcud olmayacağım danılmaz bir fakt idi və bu fikir artıq məni əzmişdi. Sonunda hamımız kimi mən də böyüyərək bu faktı qəbul etməli oldum. Biz qaçınılmaz sonluq ilə yaşamağı öyrənirik. Lakin uşağın bəsirəti həqiqət olaraq qalır. Fransız eqzistensialist[3] Jean-Paul

[3] Eqzistensializm 19-cu və 20-ci əsrdə Avropada formalaşmış fəlsəfi bir cərəyandır. Sözün geniş mənasında ilk eqzistensialist danimarkalı xristian filosof Søren Aabye Kierkegaard (1813-1855) hesab olunur. Avropada bu dünya görüşündən öncə hakim olan dünya görüşü yunan filosofu Əflatunun (Platon) essensializmi və fransız riyaziyyatçı filosof René Descartes'ın nəzəri əsasını qoyduğu kartezianizm (cartesianism) və rasionalizm təşkil edirdi. Essensialist dünya görüşünə əsasən hər bir şeyin mövcud olmadan öncə bir essensi, yəni mahiyyəti və məğzi vardır. Beləliklə də hər bir insanın doğulmadan öncə bir mahiyyəti, bir məğzi vardır. Başqa sözlə desək insanı insan edən özəlliklər, mənalar o doğulmadan öncə də mövcud idi. Eqzistensialistlər insana və ümumilikdə dünyaya bu cür baxmağı doğru hesab etmirlər, onlar üçün mövcud olmaq mahiyyətdən öncədir, yəni mövcud olmadan öncə mahiyyət və məna yoxdur. İnsan doğulduqdan sonra həyatını necə yaşamağından asılı olaraq mahiyyət və məğz kəsb edir. Rasionalistlər inanırlar ki, insanın mövcudiyyətindən asılı olmayaraq mütləq məntiqi həqiqətlər vardır və insan onlara əsaslanaraq həyat haqqındakı haqqı öyrənə bilər. Buna görə də René Descartes özü və həyat haqqındakı həqiqəti öyrənmək üçün hər şeyə şübhə edir və sonra məntiqi qaydalara əsasən ilk öncə özünün mövcudluğunu sübut edir, ondan sonra digər fəlsəfi suallara bu qaydada cavab verməyə çalışır. Eqzistensialistlərin nəzərində isə obyektiv həqiqət yoxdur, hər bir kəs üçün özünün subyektiv həqiqəti vardır və bu, insanın öz təcrübəsindən qaynaqlanan biliklərdir. Digər tərəfdən kartezianizmdə metafizik şüur ilə maddədən ibarət bədən arasında ayırım edilir. Kartezianistlərə görə şüur və ya ruh bədəndən ayrıdır, maddədən ibarət deyildir. Onlara görə ətrafımızdakı reallığı hiss və təcrübə ilə dərk etmək sadəcə illüziyadır. Məhz bu cür kartezianist dünya görüşü ilə bəzi məntiqi həqiqətlərin maddədən asılı olmadan mövcud olduğunu dərk etmək olur. Bu dualizm, yəni insanı iki hissədən ibarət görmə eqzistensializmdə yoxdur. Eqzistensialistlərə görə insan sadəcə bir bütövdür və o, "özüm" adlandıra bildiyin varlıqdır. Eqzistensialistlərin çoxu ateist olsalar da bu fəlsəfi düşüncə ateizm ilə eyni deyildir, çünki Allaha inanan eqzistensialistlər də mövcud olub. Lakin Kierkegaard kimi teistlərə görə Allaha inanmaq hansısa rasional bir düşüncədən qaynaqlanmır, əksinə hər bir kəsin şəxsi təcrübəsindən, subyektiv baxışından ortaya çıxır. Kierkegaard da digər ateist eqzistensialistlər kimi həyatın absurd olduğunu görüb təsdiqləyirdi, lakin o, bu absurdluğun imanı gərəkdirdiyini deyirdi, onun Allaha imanı bu absurdluqdan öz başlanğıcını götürürdü.

Sartre'ın[4] dediyi kimi əbədiliyi itirdikdən sonra bir neçə saat ilə bir neçə ilin arasında bir fərq qalmır.

Tez və ya gec gəlməyindən asılı olmayaraq ölüm gözləntisi və mövcud olmamaq təhlükəsi son dərəcə qorxulu bir dəhşətdir. Amma bir dəfə bu təhlükəni hiss etməyən bir tələbə ilə qarşılaşdım. Dediyinə görə fermada böyümüşdü və heyvanların doğulub öldüyünü görməyə alışmışdı. Ölüm onun üçün sadəcə olaraq təbii idi, necə deyərlər həyatın bir hissəsi idi. İkimizin ölümlə bağlı perspektivlərimizin bu qədər fərqli olması məni çox şaşırdırdı və onun mövcud olmamaq təhlükəsini nə üçün hiss etmədiyini başa düşməkdə çətinlik çəkirdim. İllər sonra Sartre'ı oxuyarkən bunun cavabını tapdığımı düşünürəm. Sartre deyir ki, biz ölümü başqasının ölümü kimi, necə deyərlər üçüncü şəxsin nöqteyi-nəzərindən gördüyümüz müddətdə ölüm bizim üçün təhlükəli görünmür. Yalnız bunu özünküləşdirdiyimizdə (internalize) və buna birinci şəxsin– "mənim ölümüm: mən öləcəm" – nöqteyi-nəzərindən baxdığımızda mövcud olmamaq təhlükəsi real təhlükəyə çevrilir. Sartre buna işarə edərək deyir ki, insanların çoxu həyatın ortasında bu birinci şəxs nöqteyi-nəzərini qəbul etmirlər; bir kimsə hətta öz ölümünə üçüncü şəxs nöqteyi-nəzərindən baxa bilir, mənim dostumun etdiyi kimi sanki bu, başqasının və ya hətta bir heyvanın ölümüdür. Amma öz ölümümün həqiqi varlıq cəhətdən əhəmiyyəti yalnız birinci şəxs baxışından dəyərləndirilə bilər, belə ki mən öləcəyimin və ədəbi olaraq mövcudiyyətimin sonuna çatacağımın həqiqətinə varıram. Mənim həyatım sadəcə olaraq yoxluqdan yoxluğa ani bir keçiddir.

Kainat özü də ölümlə üz-üzədir. Alimlər bizə kainatın genişləndiyini və onun içindəki hər bir şeyin getdikcə bir-birilərindən daha da uzaqlaşdığını deyirlər. Bu şəkildə davam etdikcə tədricən soyuqluğu artır və enerjisi tükənib gedir. Sonunda bütün ulduzlar yanıb qurtaracaq və bütün maddələr ölü ulduzlara və qara dəliklərə çökəcək. Heç bir işıq mövcud olmayacaq, heç bir istilik olmayacaq, həyatdan əsər-əlamət qalmayacaq. Sonsuz qaranlıqlara və fəzanın soyuq tənha guşələrinə doğru əbədi genişlənən, sadəcə ölü ulduzların və qalaktikaların

---

[4] Jean-Paul Sartre (1905-1980) fransız eqzistensialist filosofdur. Nietzsche'nin Allahın öldürüldüyünü elan etməyini olduğu kimi qəbul edərək Sartre həyatda obyektiv mənəvi dəyərlərin olduğunu və ya həyatın mənasının olduğunu inkar edirdi. Ona görə hər bir insan özü üçün istədiyi dəyərləri və məqsədləri uydurmaqda sərbəstdir. (tərc.)

cəsədlərindən ibarət olacaq – xarabalığa çevrilmiş kainat. Beləliklə də nəinki hər bir fərdin həyatı, bütövlükdə bütün insan irqi məhkumdur. Qurtuluş yoxdur, ümid yoxdur.

## Allah və əbədiyyət olmadan həyatın absurdluğu

Əgər Allah yoxdursa o zaman insan və kainat ölümə məhkumdur. Ölümümüzə hökm verilmiş dustaqlar kimi öz qaçınılmaz edamımızı gözləyirik. Allah yoxdur və əbədilik deyilən bir şey də yoxdur. O zaman bunun aqibəti nədir? Bu o deməkdir ki, həyat özlüyündə absurddur. Bu o deməkdir ki, sahib olduğumuz bu həyatın son bir əhəmiyyəti, dəyəri və ya amalı yoxdur. Gəlin bunların hər birinə ayrılıqda baxaq.

## Əbədilik və Allah olmadan son bir məna yoxdur

Əgər hər bir fərd öldükdə mövcudiyyətdən silinirsə o zaman biz onun həyatına necə yekun bir əhəmiyyət verə bilərik? Onun nə zamansa ümumiyyətlə mövcud olmağının bir önəmi varmı? Onun həyatı müəyyən başqa hadisələrə nisbətdə önəmli ola bilər, lakin o hadisələrdən hər birinin yekun əhəmiyyəti nədir ki? Əgər bu hadisələrin hamısı mənasızdırsa o zaman onlardan hansısa birinə təsir etməyin yekun bir mənası nə ola bilər? Yekun olaraq heç bir fərq etmir.

Buna başqa perspektivdən bax! Alimlər deyirlər ki, kainat 13 milyard il öncə "*Böyük Partlayış*" (big bang) adlanan partlayışdan öz başlanğıcını götürür. Fərz et ki, bu "böyük partlayış" heç bir zaman baş verməyib. Fərz et ki, kainat heç zaman mövcud olmayıb. Yekun olaraq bu, nə fərq edəcək ki? Kainat onsuz da ölməyə məhkumdur. Ən sonda kainatın nə zamansa mövcud olub olmaması heç bir əhəmiyyət kəsb etmir. Ona görə də bunun yekun bir önəmi yoxdur.

Eyni şey insan irqi haqqında da doğrudur. Bəşəriyyət ölən kainatda ölümə məhkum edilmiş bir irqdir. İnsan irqi sonda mövcudiyyətini durduracağı üçün onun nə vaxtsa mövcud olub olmamasının önəmli bir fərqi yoxdur. Bu baxımdan bəşəriyyət ağcaqanad sürüsündən və ya donuz dəstəsindən daha önəmli deyildir, çünki hamısının sonu birdir.

Onları ilk növbədə vücuda gətirən kor-koranə kosmik proses sonda da onları yenidən məhv edəcək.

Eyni şey hər bir insan fərdi üçün də doğrudur. Bəşər biliklərinin inkişafı üçün alimlərin töhfələri, ağrı və iztirabı azaltmaq üçün həkimlərin araşdırmaları, dünyada sülhü təmin etmək üçün diplomatların səyləri, bəşər irqinin bir çox tərəfini yaxşılaşdırmaq üçün yaxşı insanların hər sahədə göstərdikləri fədakarlıqları – bunların hamısı bir heçə gəlib çıxır. Bu, *müasir insanın* qorxusudur; çünki onun sonluğu bir heç ilə bitir, o, bir heçdir.

Ancaq əgər həyat mənalı olacaqsa o zaman insanın bu məqsəd üçün ehtiyac duyduğunun sadəcə ölümsüzlük olmadığını da görmək önəmlidir. Mövcudiyyətin mücərrəd olaraq davam etməsi həmin mövcudiyyəti mənalı etmir. Amma əgər Allah mövcud olmazsa insanın və kainatın əbədi yaşaya bilməsi onların vücuduna hələ də hansısa yekun bir əhəmiyyət qazandırmayacaq. Bunun təsviri belədir: Bir dəfə elmi fantastik hekayə oxudum və orada bir astronavt fəza boşluğundakı həyatsız bir qaya parçasına tənha qalması üçün atılır. Onun yanında iki



şüşə qab var idi; onlardan birində zəhər və digərində ona əbədi həyat verəcək bir içki var idi. Özünün çətin vəziyyətini dərk edən astronavt zəhəri içir. Lakin daha sonra dəhşət içində səhv şüşəni içdiyini kəşf edir; o, ölümsüzlük şərbətini içmişdi. Bu isə o demək idi ki, o, əbədi həyatı – mənasız, sonsuz həyatı yaşamaqla lənətlənmişdi. İndi əgər Allah mövcud deyilsə bizim hamımızın həyatı bunun kimidir. Bu həyat sonsuz şəkildə davam edə bilər və hələ də son dərəcə mənasız olacaq. Biz hələ də həyatdan soruşa bilərik: "İndi nə olsun?" Deməli həyatın mənalı olması üçün insanın ehtiyacı olduğu sadəcə əbədilik/ölümsüzlük deyildir; o, həm Allaha, həm də ölümsüzlüyə ehtiyac hiss edir. Əgər Allah mövcud deyilsə insan bunların heç birinə sahib deyildir.

İyirminci əsrin insanı bunu dərk edə bildi. Bunun üçün Samuel Beckett'in[5] yazdığı "*Waiting for Godot*" (Qodotu gözləyərkən) pyesini oxu! Bütün pyes boyunca iki nəfər üçüncü nəfərin gəlişini gözlədikləri müddətdə boş bir söhbət edirlər və o üçüncü nəfər heç zaman gəlib çıxmır. "Bizim həyatımız da bunun kimidir" – Beckett deyir; biz gözlədiyimiz müddətdə sadəcə vaxtımızı öldürürük – bəs nəyi gözləyirik? Bunu da bilmirik. İnsan faciəsini təsvir etmək üçün Beckett daha bir pyes yazır. Burada pərdə qalxır və zir-zibil ilə dolmuş bir səhnə ortaya çıxır. Düz otuz saniyə içində tamaşaçılar tam səssizlik içində oturaraq həmin zibilliyə baxır. Sonra pərdələr bağlanır. Hamısı elə bundan ibarətdir.

Jean-Paul Sartre və Albert Camus[6] kimi fransız eqzistensiyalistləri də bunu anlayırdılar. Sartre özünün "Huis Clos" (Qapalı Qapılar Arxasında) adlı pyesində həyatı cəhənnəm olaraq təsvir edir və pyesin ən son cümləsi fəlakətə təslim olmağı ifadə edən sözlərdir: "Nə demək olar ki? Həyatımıza davam edək!" Bu səbəbdən Sartre başqa bir yerdə mövcudiyyətin *ürək bulandırıcı effekti* (nausée) haqqında yazır. Camus da

---

[5] Samuel Barclay Beckett (1906-1989) irlandiya əslli novelist, dramaturq və teatr direktorudur. Həyatının böyük hissəsini Parisdə yaşayıb. Həm ingilis, həm də fransız dilində yazıb. 1969-cu ildə ədəbiyyat sahəsində nobel mükafatına layiq görülüb. Onun ən məşhur pyesi səhnəyə ilk qoyulmuş əsəri "Waiting for Godot" sayılır.

[6] Albert Camus (1913-1960) fransız eqzistensialist novelistdir. Allaha inanmadığı üçün, Allahın mövcudluğunu inkar etdiyi üçün Camus həyatda bir məna olmadığını deyirdi. Ona görə həyat nəinki mənasızdır, hətta qarışıq və qəddardır. Fəlsəfi problemlər içində yalnız intiharı ən ciddi problem hesab edirdi. Həyatı mənasız hesab etməyinə baxmayaraq Camus intiharın əleyhinə idi və bəşəri qardaşlığın qorunulması uğrunda mübarizə aparmağın tərəfdarı idi. (tərc.)

həmçinin həyatı absurd hesab edirdi. “*L’Étranger*” (Yad) adlı kiçik novellasında Camus’nun əsərinin qəhramanı ani bir bəsirət ilə kainatın bir mənasının olmadığını və kainata məna verə biləcək Allahın olmadığını kəşf edir.

Beləliklə də əgər Allah yoxdursa həyat mənasızlaşır. İnsan və kainat yekun bir əhəmiyyətdən məhrum olur.

## Ölümsüzlük və Allah olmadan real dəyər də mövcud deyildir

Əgər həyat qəbirdə sona çatırsa o zaman bir kəsin həyatında Stalin kimi yoxsa bir müqəddəs şəxsiyyət kimi yaşamağı fərq etmir. Çünki bir kəsin aqibəti onun davranışından asılı deyildir, ona görə də sən istədiyin kimi yaşaya bilərsən. Dostoyevski bunu belə ifadə edir: ”Əgər ölümsüzlük yoxdursa o zaman hər şey icazəlidir.” Bu əsasdan çıxış edərək Ayn Rand[7] kimi bir yazıçı eqoizmin üstünlüklərini tərifləməkdə tamamilə haqlıdır. Yalnız özün üçün yaşa! Səni heç kim hesaba çəkən deyildir! Əlbəttə ki, bu halda başqa cür yaşamaq axmaqlıq olacaq, çünki həyat, öz şəxsi mənfəətindən başqası üçün çalışmaqla riskə atılmayacaq qədər çox qısadır. Başqa insan üçün fədakarlıq etmək bu nəzərdən axmaqlıq olmalıdır. Allah olmadan da əxlaq nəzəriyyəsinin mümkünlüyünü müdafiə etməyə cəhd göstərən ateist filosof Kai Nielsen[8] sonunda etiraf edərək deyir:

> “**Əqlin əxlaqi yanaşmanı tələb etdiyini və ya əfsanə və ideologiyalara aldanmamış bütün rasional kəslərin fərdi**

[7] Ayn Rand (1905-1982) adı ilə tanınan yazıçının əsl adı Alisa Zinovyevna Rosenbaum’dur. Novelist, filosof və teatr səhnələri üçün əsr yazmış müəllif olaraq tanınan Ayn Rand Rusiyada doğulmuş və orada təhsil almışdı. 1926-cı ildə ABŞ-a köçür və fəaliyyətinə orada davam edir. Obyektivizm (objectivism) fəlsəfi cərəyanının əsasını qoymuş Ayn Rand eyni zamanda rasionalizmin və eqoizmin tərəfdarıdır. O, dövlət nəzarətinə qarşı olduğu kimi anarxizmə də qarşı idi, dövlət müdaxiləsindən azad şəkildə çalışan kapitalizmin tərəfdarı idi.

[8] 1926-cı ildə doğulmuş Kai Nielsen ateist filosofdur. Hal-hazırda Kanadada yaşayır və Kanada Kraliyyət Cəmiyyətinin üzvüdür. 1991-ci ildə bu essenin müəllif William Craig ilə “Allah, Mənəviyyat və Şər” mövzusu haqqında debatda iştirak edib.

**eqoistlər və ya klassik amoralistlər**[9] **olmağa ehtiyac duymadıqlarını biz sübut edə bilməmişik. Əql burada qərar verə bilmir. Sizin üçün canlandırdığım şəkil heç də xoş bir şəkil deyildir. Bu barədə düşünmək özümü də kədərləndirir ... Təmiz praktiki əql, hətta faktlar barəsində kifayət qədər biliklərlə belə səni mənəviyyata aparmayacaq.**”[i]

Lakin problem daha da ağırlaşır. Çünki ölümsüzlükdən asılı olmayaraq əgər Allah yoxdursa doğru və yalnışın obyektiv standartları ola bilməz. Bizim üzləşdiyimizin tamamı – Jean-Paul Sartre-ın deyimi ilə - mücərrəd, dəyərsiz mövcud olma faktıdır. Mənəvi dəyərlər ya fərdi zövqün ifadəsidir ya da sosio-biolojik təkamülün *artıq məhsuludur*,[10] təhsil və mühitin təsiridir. Allahsız bir dünyada kimin nəyin doğru, nəyin yalnış olduğunu demək haqqı vardır? Adolf Hitler'in dəyərlərinin müqəddəs bir şəxsiyyətin dəyərlərindən daha aşağı olduğuna hökm edəcək kim var? Mənəviyyat nəzəriyyəsi Allahsız kainatda tamamilə öz mənasını itirir. Necə ki, müasir ateist etika alimi buna işarə edərək deyir:

“**Bir şeyin “Allah qadağan etdiyi üçün yalnış olduğunu” demək Qanunverici Allaha inanan hər bir kəs üçün son dərəcə anlaşıla biləndir. Amma qadağan edən Allah mövcud olmadığı halda nəyinsə yalnış olduğunu demək anlaşılmazdır...**”. “**Allah inancı olmadan mənəvi vəzifə/borc konsepti başa düşülməzdir. Sözlər qalır, amma onların mənaları yox olub.**”[ii]

Allahsız bir dünyada heç bir obyektiv doğru və yalnış ola bilməz, yalnız bizim mədəniyyətdən təsirlənmiş və fərdi olaraq nisbi, subyektiv mühakiməmiz ola bilər. Bu o deməkdir ki, müharibəni, zülmü və cinayəti

---

[9] Amoralistlər mənəviyyət məsələlərinə önəm verməyən kəslərdir. Onlar üçün mənəviyyatla bağlı suallar əhəmiyyət kəsb etmir. Həmçinin obyektiv mənəvi dəyərlərin də mövcud olduğunu qəbul etmirlər.

[10] Artıq və ya izafi məhsul ilə qəsd edilən istehsal nəticəsində ortaya çıxan kənar məhsullardır. Misal üçün taxta materiallar istehsal etmə prosesində əmələ gələn qıxmıq, talaşa kimi məhsullar artıq məhsul, izafi məhsul hesab olunur. Ateistlərin insana baxışı da bunun kimidir, çünki onlar fiziki proseslərin bir məqsəd üçün başladıldığını inkar etdikləri üçün bu proseslər nəticəsində əmələ gəlmiş hər bir məhsulu artıq məhsul, kənar məhsul hesab etməlidirlər. Onlar insanı mücərrəd olaraq fiziki prosesin məhsulu gördükləri üçün onlara görə insan kənar bir produkt, yəni subprodukt olmalıdır.

şər olaraq qınamaq mümkün deyildir. Eyni şəkildə heç kim qardaşlığı, bərabərliyi və məhəbbəti xeyir olaraq tərifləyə bilməz. Çünki Allahsız kainatda xeyir və şər mövcud deyildir, sadəcə mücərrəd, dəyərsiz mövcud olma faktı vardır və "sən haqlısan, mən yalnışam" demək haqqına sahib heç kim yoxdur.

## Ölümsüzlük və Allah olmadan son amal yoxdur

Əgər ölüm, yol cığırının sonunda açıq qucaqla durub bizi gözləyirsə o zaman həyatın hədəfi nədir? Bunların hamısı heç bir şey üçündürmü? Həyat üçün bir məqsəd yoxdurmu? Bəs kainat? O da məqsədsizdirmi? Əgər onun aqibəti fəza boşluğundakı tənha guşələrdəki soyuq qəbirdirsə o zaman cavab - "bəli, məqsədsizdir" - olmalıdır. Kainat üçün heç bir hədəf, heç bir məqsəd yoxdur. Ölü kainat qalığı əbədi olaraq genişlənib yayılmağa davam edəcək.

Bəs insan? Bəşər irqinin ümumiyyətlə heç bir məqsədi yoxdurmu? Yoxsa o da sadəcə olaraq biganə kainatın unutqanlığında bir gün tükənib itəcək? İngilis yazıçı H. G. Wells[11] bu istiqbalı öncədən görüb. "*The Time Machine*" (Zaman Maşını) adlı novellasında Wells'in zaman səyahətçisi insanın aqibətini kəşf etmək üçün gələcəyin uzaqlıqlarına doğru səyahət edir. Tapdığı yeganə şey – bir az şibyə və mamır müstəsna – nəhəng qırmızı günəşin ətrafında dövr edən ölü Yer kürəsidir. Eşitdiyi yeganə səslər küləyin axımı və dənizin ahəstə ləpələridir. "**Bu həyatsız səslərdən ötədə...**" – Wells yazır – "**...dünya səssiz idi. Səssiz? Onun sükunətini ifadə etmək çətin olacaq. İnsanların bütün səsləri, qoyunların bəyrişməsi, quşların çığırtıları, həşəratların vızıltısı, həyatımızda arxa fonu təşkil edən səs-küy, bunların hamısı artıq yox olmuşdu.**"[iii] Beləliklə də Wells'in zaman səyahətçisi geri qayıdır. Amma nəyə geri dönür? Sadəcə olaraq unutqanlığa doğru hərəkət edən məqsədsiz axımda daha öncəki zaman kəsişiminə. Daha öncə dinsiz biri

[11] Herbert George Wells (1866-1946) ingilis yazıçısı olub. Novella, qısa hekayələr, felyetonlar yazmağına baxmayaraq ən çox elmi-fantastik əsərlərinə görə tanınır. Jules Verne və Hudo Gernsback ilə yanaşı elmi fantastikanın banilərindən hesab olunur. Ədəbiyyat üzrə nobel mükafatına dörd dəfə namizəd olaraq irəli sürülüb.

ikən Wells'in kitabını ilk dəfə oxuduqda öz-özümə dedim: "Yox! Yox! Bu şəkildə qurtara bilməz!" Amma əgər Allah yoxdursa, xoşlasan da xoşlamasan da bu şəkildə qurtaracaq. Allahsız kainatın həqiqəti budur; ümid yoxdur, məqsəd yoxdur.

Ümumilikdə bəşəriyyət üçün həqiqət nədirsə fərdi olaraq hər birimiz üçün də ayrılıqda həqiqət odur; bizim burada varlığımız məqsədsizdir. Əgər Allah yoxdursa bizim həyatımız keyfiyyət baxımından bir köpəyin həyatından fərqli deyildir. "*Ecclesiastes*" (Vaiz) kitabının qədim müəllifi bunu bu cür ifadə edir: "**İnsan oğullarının taleyi ilə heyvanların taleyi eynidir. Biri öldükdə digəri də ölür; şübhəsiz ki, hamısının eyni nəfəsi var və insanın heyvandan üstünlüyü yoxdur, çünki hər şey puçdur. Hamısı eyni yerə gedir. Hamısı torpaqdan yaranıb, torpağa da qayıdır.**" (Bibliya, Vaiz 3:19-20) Bibliya kitabından çox, müasir eqzistensialist ədəbiyyatından bir hissə kimi səslənən bu kitabda müəllif, sonu ölümə məhkum olan bir həyatda həzzin, zənginliyin, təhsilin, siyasi şöhrətin və şərəfin faydasızlığını göstərir. Onun qərarı nədir? "**Puçun puçu! Hər şey puçdur!**" (Vaiz, 1:2) Əgər həyat qəbirdə qurtarırsa o zaman bizim yaşamaq üçün yekun bir məqsədimiz yoxdur.

Əslində vəziyyət bundan da pisdir; hətta bu ölümlə qurtarmasa da Allah olmadan həyat məqsədsiz olaraq qalır. Çünki bu halda insan və kainat təsadüfdən doğmuş adi qəzalardır, heç bir məqsəd olmadan mövcudluğa soxulmaqdır. Allah yoxdursa kainat kosmik bir qəzanın, təsadüfi partlayışın nəticəsidir. Mövcud olması üçün heç bir məna yoxdur. İnsana gəldikdə isə o, təbiətin əcaibliyidir – maddə üstə gəl vaxt, üstə gəl şansın kor məhsuludur. İnsan rasionallığı təkamül etmiş sadəcə çöküntü parçasıdır. Bir filsəfəçinin ifadə etdiyi kimi "**insan həyatı təhtəlbəşər bir pedestal üzərində qurulub və sakit, ağılsız kainatın göbəyində öz çarəsinə baxmaq üçün tərk edilib.**"[iv]

Kainat və bəşər irqi haqqında doğru olan həm də ayrı-ayrı fərdlər olaraq bizim haqqımızda da doğrudur. Əgər Allah mövcud deyilsə o zaman sən təbiətin *düşürdüyü uşaqsan*, mənasız həyat yaşamaq üçün mənasız kainata zorla atılmış bir varlıqsan.

Beləliklə də əgər Allah mövcud deyilsə bu o deməkdir ki, insan və kainat heç bir məqsəd olmadan – çünki hər bir şeyin sonu ölümdür – mövcuddur

və onlar heç bir məqsəd üçün vücuda gəliblər, çünki onlar sadəcə şansın doğurduğu kor məhsullardır. Sözün qısası; həyat son dərəcə məqsədsizdir.

Qarşımızdakı seçimlərin ağırlığını başa düşə bilirsənmi? Çünki əgər Allah mövcuddursa o zaman insan üçün ümid vardır. Amma əgər Allah mövcud deyilsə o zaman bizə qalan yeganə şey ümidsizlikdir. Allahın mövcudluğu sualının insan üçün bu qədər mühüm olmasını anlayırsanmı? Bir yazıçının tutarlı olaraq qeyd etdiyi kimi "əgər Allah "ölübsə" insan da ölüdür."

Çox təəssüf ki, insan kütləsi bu faktı dərk etmir. Sanki heç bir şey dəyişməmiş kimi onlar yaşamlarına davam edirlər. Bu mənə Nietzsche'ni[12]n dəli adam haqqındakı hekayəsini xatırladır ki, dəli adam səhər çağının erkən saatlarında əlində çıraq tutaraq bazar ərazisinə ani giriş edir və qışqıraraq deyir: "Mən Allahı axtarıram! Mən Allahı axtarıram!" Orada duranların çoxu Allaha inanmadıqları üçün dəli adam onların gülüşünə səbəb oldu. "Allah yolunu azıbmı?" deyərək onlar istehza etdilər. "Yoxsa gizlənir? Ya da ola bilsin ki, səyahətə çıxıb və yaxud da mühacirət edib!" Beləliklə də onlar qışqırırdılar və gülürdülər. Sonra – Nietsche yazır ki, - dəli adam onların ortasında ətrafına çevrildi və onlara iti baxışlarla baxaraq:

> "**Allah hara gedib?" – o qışqırdı, "Qoyun mən sizə deyim. Biz – sən və mən - Onu öldürmüşük. Hamımız onun qatilləriyik. Amma biz bunu necə etmişik? Dənizin suyunu içib qurtarmağa necə qadir olduq? Üfüqün tamamını silib yox etmək üçün süngəri bizə kim verdi? Biz bu Yeri öz günəşindən qırıb azad etməklə nə etdik? İndi hara doğru gedir bəs? Bütün günəşlərdən uzaqlara? Biz davamlı dalış etmirikmi? Arxaya, kənarlara, qarşıya, hər istiqamə?**

---

[12] Friedrich Wilhelm Nietzsche (1844-1900) alman filosof, bəstəkar, şair, filoloqdur. Onun fikirləri Qərb fəlsəfəsinə və müasir intellektual tarixə çox dərin təsir göstərib. Nietzsche sözün əsl mənasında ateist eqzistensialistdir. O, ateizmi öz məntiqi nəticəsinə gətirərək nihilist dünya görüşünü müdafiə edib. Nietzsche'yə görə maarifçilik dövründən sonra Avropa və ümumilikdə Qərb xristianlığın böhranı ilə nihilist cəmiyyətlərə çevrilirlər. O, öz zamanında cəmiyyətlərin hələ də tam nihilist olmadığını qeyd edirdi, ona görə nihilizm getdikcə daha da yayğınlaşacaq və qəbul ediləcək. Nietzsche 1889-cu ildə 44 yaşında əqlini itirir və 1900-cu ilə qədər bu halda yaşayır və ölür.

> **Bundan sonra ümumiyyətlə yuxarı və aşağı qalıbmı? Sonsuz heçliyin içərisindən keçirmişik kimi yolmuzu azıb girlənmirikmi? Boş fəzanın nəfəsini hiss etmirikmi? Daha da soyuq deyilmi? Davamlı olaraq gecə və yenə də gecə gəlmirmi? Səhərlər çıraqlar yandırılmamalıdırmı? Allahı dəfn edən qəbir qazanların səsindən bir şey hələ də eşitmirikmi? ... Allah ölüdür... və Onu biz öldürmüşük. Bundan sonra biz, qatillərin qatili, özümüzə necə təskinlik tapacağıq?**”[v]

Camaat sükunət və heyrət içində gözlərini dəli adama zilləmişdi. Sonunda o, çırağını yerə atdı. “Mən çox erkən gəlmişəm,” – dedi. “Bu əzəmətli hadisə hələ də baş verməkdədir; bunun xəbəri insanın qulağına hələ çatmayıb.” Allahı öldürməklə etdiklərinin aqibətini insanlar hələ də tam bir mənada qavramamışdılar. Amma Nietzsche insanların bir gün ateistik inanclarının gərəkdirdiyi nəticələri dərk edəcəklərini qabaqcadan xəbər verirdi. Bu dərk etmə, həyatdakı bütün dəyər və mənaların məhvi, yəni nihilizm dövrünü başladacaq.

İnsanların çoxu hələ də ateizmin tələb etdiyi nəticələr üzərində düşünmürlər və (Nietzsche’nin əsərində keçən) bazardakı camaat kimi qafilcəsinə həyatlarına davam edirlər. Amma biz, Nietzsche’nin başa düşdüyü kimi, ateizmin nə mənaya gəldiyini dərk etdiyimizdə onun verdiyi sual üzərimizə ağır bir yük kimi çökür: “Biz, qatillərin qatili, özümüzə necə təskinlik tapacağıq?”

## Ateizmin praktiki mümkünsüzlüyü

Ateistin təklif edə biləcəyi yeganə həll yolu bu ola bilər ki, biz həyatın absurdluğunu qəbul edirik və cəsarətlə yaşayırıq. Misal üçün Bertrand Russell[13] yazır ki, biz həyatımızı “**qərarlı ümidsizliyin möhkəm bünövrəsi**”[vi] üzərində qurmalıyıq. Dünyanın qorxunc bir yer olduğunu

---

[13] Bertrand Arthur William Russell (1872-1970) ingilis filosof, riyaziyyatçı, tarixçi, yazıçı, siyasi aktivist və novel laureatıdır. Bertrand Russell aqnostik olub, mənəvi dəyərlər məsələsində isə utilitarian olub. Utilitarianizmə görə ən yaxşı dəyər ən çox fayda verən dəyərdir.

etiraf etdikdən sonra biz ancaq həyata uğurla uyğunlaşa bilərik. Camus deyirdi ki, biz səmimi olaraq həyatın absurdluğunu etiraf etməliyik və sonra bir-birimiz üçün sevgi içində yaşamalıyıq.

Ancaq bu cür həll yolundakı fundamental problem budur ki, belə bir dünya görüşü ilə eyni zamanda həm inandıqlarına sadiq olaraq, həm də xoşbəxt olaraq yaşamaq mümkün deyildir; əgər kimsə xoşbəxt yaşayırsa bu yalnız inandıqlarına sadiq yaşamadığına görədir. Francis Schaeffer[14] bu nöqtəni çox gözəl izah edib. Müasir insan.. – deyir Schaeffer, - iki mərtəbəli kainatda yaşayır. Aşağı mərtəbədə sonu olan Allahsız dünyadır; burada həyat – bizim gördüyümüz kimi – mənasızdır. Yuxarı mərtəbədə isə məna, dəyər və məqsəd vardır. Beləliklə də müasir insan aşağı mərtəbədə yaşayır, çünki o, Allahın mövcud olmadığına inanır. Lakin o, belə absurd dünyada xoşbəxt yaşaya bilməz; buna görə də o, tez-tez yuxarı mərtəbəyə iman sıçrayışları (leaps of faith) edir ki, mənanı, dəyəri və məqsədi təsdiqləsin, halbuki onun buna haqqı yoxdur, çünki o, Allaha inanmır.

O zaman insanın öz ateistliyi ilə yanaşı xoşbəxt və inancına sadiq şəkildə yaşaya bilməyəcəyini göstərmək üçün gəlin bir daha Allahsız həyatın absurd olduğunu gördüyümüz hər üç sahəyə nəzər salaq.

## Həyatın mənası

Birinci “məna” sahəsinə baxaq. Gördük ki, Allah olmadan həyat məna kəsb etmir. Buna baxmayaraq filosoflar sanki həyatın mənası varmış kimi yaşamağa davam edirlər. Misal üçün Sartre sübut etməyə çalışır ki, hər bir kəs sərbəst olaraq müəyyən bir fəaliyyət kursunu izləməyi seçməklə öz həyatı üçün məna yarada bilər. Sartre özü marksizmi seçmişdi.

Əslində bu, açıq-aşkar uyğunsuzluqdur. Həyatın obyektiv olaraq absurd olduğunu söyləmək və sonra hər kəsin öz həyatı üçün məna yarada biləcəyini demək bir-biri ilə uyğun gəlmir. Əgər həyat həqiqətən də absurddursa deməli insan aşağı mərtəbədə ilişib qalıb. Öz həyatına məna qatmağa çalışmaq yuxarı mərtəbəyə sıçrayışı təmsil edir. Amma Sartre’ın

[14] Francis August Schaeffer (1912-1984) amerikan teoloq, filosof və kilsə rahibidir.

bu sıçrayış üçün bir əsası yoxdur. Allah yoxdursa həyatın obyektiv bir mənası ola bilməz. Sartre'ın təklif etdiyi proqram həqiqətdə özünü aldatmaqla məşğul olmaqdır. Sartre'ın əslində dediyi budur: "Gəlin özümüzü elə aparaq ki, sanki həyatın mənası vardır." Bu isə doğrusu özümüzü axmaq yerinə qoymaqdır.

Sözümüzün məğzi budur: Əgər Allah yoxdursa o zaman həyat obyektiv olaraq mənasızdır. Lakin insan həyatın mənasızlığını bilərək həm inancına sadiq olaraq, həm də xoşbəxt şəkildə yaşaya bilməz. Ona görə də xoşbəxt yaşamaq üçün yalandan özünü həyatın mənası olduğuna inandırmağa çalışır. Amma əlbəttə ki, bu, insanın bildiyi, inandığı ilə tamamilə uyğunsuzluq təşkil edir, çünki Allah olmadan insan və kainat heç bir həqiqi əhəmiyyətə sahib deyildir.

## Həyatın dəyəri

İndi dəyər probleminə gələk. Ən abırsız uyğunsuzluqlar məhz burada yatır. Hər şeydən öncə ateistik humanistlər məhəbbət və qardaşlıq kimi ənənəvi dəyərləri təsdiq etməklə tam bir ziddiyyətə düşürlər. Ziddiyyətli bir şəkildə həm həyatın absurdluğuna, həm də bəşəri sevgi və qardaşlıq kimi mənəviyyata inandığı üçün Camus haqlı olaraq tənqid edilmişdi. Bu ikisi məntiq baxımından bir-biri ilə bir araya gələ bilməz. Bertrand Russell da həmçinin ziddiyyətdə idi. Ateist olmasına baxmayaraq o, açıq sözlü sosial tənqidçi idi; müharibəni və cinsəl azadlıqlara qoyulmuş məhdudiyyətləri inkar edirdi. Russell etiraf edirdi ki, o, "mənəvi dəyərlər sadəcə şəxsi zövq məsələsidir" deyərək yaşaya bilməz və o, bu səbəblə öz görüşlərini "inanılmaz" hesab edirdi. "**Mən bu problemi necə həll etməyin yolunu bilmirəm**" – deyərək etiraf edirdi.[vii] Mövzunun məğzi budur ki, əgər Allah yoxdursa o zaman doğru və yalnış obyektiv olaraq mövcud ola bilməz. Dostoyevski'nin dediyi kimi "hər bir şey icazəlidir."

Amma insanın bu şəkildə yaşaya bilməyəcəyini Dostoyevski özü də söyləyirdi. Sanki əsgərlər üçün günahsız uşaqları qətl etmək tamamilə

normalmış kimi düşünərək insan yaşaya bilməz. Pol Pot[15] kimi diktatorların milyonlarla öz həmvətənini yox etməsi normaldır deyərək yaşaya bilməz. Ondakı hər bir şey bu əməllərin yalnış olduğunu, tamamilə yalnış olduğunu qışqırmaq istəyir. Amma əgər Allah yoxdursa o, bunu edə bilməz. Buna görə də iman sıçrayışı edir və istənilən halda dəyərləri qəbul edir. Bunu etdikdə Allahsız dünyanın tutarsızlığını üzə çıxarmış olur.

Bir neçə il bundan öncə BBC kanalında "The Gathering" (Toplantı) adlı sənədli filmi izlədiyimdə dəyərlərdən məhrum olmuş dünyanın dəhşəti evimə yeni bir şiddət ilə gətirildi. Bu film yəhudi qətliamında sağ qalanların Qüds şəhərində bir araya gəlməsi haqqında idi; orada onlar itirilmiş dostluqları yenidən kəşf etdilər və öz təcrübələrini bölüşdülər. Bir qadın məhbus, xəstə baxıcısı, Auschwitz kampında necə ginekoloq olması hekayəsini danışırdı. O, Doktor Mengele'nin göstərişi ilə əsgərlər tərəfindən hamilə qadınların necə bir dəstə halına gətirildiklərini və eyni baraklarda saxlanıldıqlarını xatırlayırdı. Bir müddət keçdi və gördü ki, həmin qadınlardan heç biri onun gözünə dəymir. Bunu araşdırdı: "O baraklardakı hamilə qadınlar hardadır?" "Eşitməmisənmi?" – cavabı gəldi, "Doktor Mengele onları eksperimental əməliyyatlarda istifadə etdi."

Bir başqa qadın körpəsini əmizdirə bilməsin deyə Mengele'nin necə onun döşünü bağlaması haqqında danışdı. Doktor körpənin yeyəcək olmadan nə qədər sağ qala biləcəyini öyrənmək istəyirdi. Naəlaclıqdan bu yazıq qadın qəhvəyə batırılmış çörək tikələrini uşağına verməklə onu həyatda saxlamağa çalışırdı, amma heç bir fayda vermirdi. Hər gün uşaq çəki itirirdi və bu, Doktor Mengele'nin səbirsizcə müşahidə etdiyi bir fakt idi. Bir xəstə baxıcısı gizlincə bu qadının yanına gəldi və ona dedi: "Sənin buradan çıxa bilməyin üçün bir yol təşkil etmişəm, amma uşağını özünlə götürə bilməzsən. Uşağının həyatına son qoymaq üçün ona verə biləcəyin bir morfin iynəsini də özümlə gətirmişəm." Qadın buna etiraz etdikdə xəstə baxıcısı israrla dedi: "Bax, sənin uşağın hər bir halda öləcək. Heç olmazsa özünü xilas elə!" Beləliklə də bu ana öz uşağının həyatına son

[15] Pol Pot (1925-1998) Kambocada siyasi və dövlət xadimi olub. Qırmızı kxmerlərin lideri və diktator olub. Pol Potun hakimiyyəti dövrü kütləvi represiyalar və aclıqla müşahidə olunmuşdur.

qoydu. Doktor Mengele bu barədə xəbər tutduqda çox qəzəblənmişdi, çünki eksperiment nümunəsini əldən qaçırmışdı və o, sonuncu dəfə çəkisini ölçmək məqsədi ilə körpənin atılmış cəsədini tapmaq üçün ölülərin arasında axtarış etdi.

Bu hekayələri dinləməklə qəlbim parçalanırdı. Düşərgədən sağ çıxmış bir ravvin – "sanki Auschwitz'də On Əmr'in tərsinə işlədiyi bir dünya mövcud idi" – deməklə bir cümlədə bunu gözəl cəm edir. Bəşəriyyət heç zaman belə bir cəhənnəm görməmişdi.

Bununla belə əgər Allah mövcud deyilsə bizim dünyamız müəyyən mənada bir Auschwitz'dir: mütləq doğru və xəta yoxdur, hər bir şey icazəlidir. Amma bir ateist, bir aqnostik belə bir dünya görüşü ilə ziddiyyətsiz yaşaya bilməz. Xeyir və şərdən ötədə yaşamağın zərurətini elan edən Nietsche özü mentoru hesab etdiyi bəstəkar Richard Wagner ilə məhz onun antisemitizminə və kəskin alman milliyyətçiliyinə görə əlaqələri kəsmişdi. Eynilə Sartre ikinci dünya müharibəsindən sonra yazarkən antisemitizmi qınayırdı, məhvə gətirib çıxaran bir doktrinin sadəcə əksi ilə eyni dəyərdə olan bir rəy və ya şəxsi zövq məsələsi olmadığını bəyan edirdi.[viii] "Existentialism Is a Humanism" adlı önəmli essesində Sartre ilahi fitri dəyərlərin mövcudluğunu inkar etməsi ilə insanların dəyərlərini israrla təsdiqləmək istəyi arasındakı ziddiyyətdən qurtulmaq üçün bihudə bir mübarizə sərgiləyir. Russell kimi o da mütləq mənəvi dəyərləri inkar etməyin nəticələri ilə yaşaya bilmirdi.

İkinci problem isə budur ki, əgər Allah mövcud deyilsə və ölümsüzlük deyilən bir şey yoxdursa, o zaman insanların etdikləri şər əməllər cəzasız və yaxşı insanların etdikləri fədakarlıqlar isə mükafatsız qalacaq. Amma kim belə bir dünya görüşü ilə yaşaya bilər axı? Kommunist həbsxanalarında öz inancına görə işgəncə görmüş Richard Wurmbrand deyir:

> "**Yaxşılıq üçün mükafatın və şər üçün cəzanın olduğuna inanmadıqda ateizmin qəddarlığına inanmaq çox çətin olur. Bu halda insan olmaq üçün yaxşı bir səbəb yoxdur. Bu halda insanda olan şərrin dərinliklərindən çəkinmək üçün bir səbəb yoxdur. İşgəncə verən kommunistlər tez-tez deyərdilər: "Allah yoxdur! Axirət də, zülmə görə cəza**

> **da yoxdur. Biz ürəyimiz istəyəni edə bilərik!" Mən hətta işgəncə verənlərdən birini belə deyərkən eşitdim: "İnanmadığım Allaha şükür edirəm ki, qəlbimdəki bütün şərri ifadə edə bildiyim bir halda bu saata qədər yaşaya bilmişəm." O bunu inanılmaz qəddarlıqla və dustaqlara qarşı tətbiq edilmiş vəhşiliklə ifadə edirdi.**"[ix]

Eyni şey fədakarlıq əməllərinə də aiddir. Bir neçə il öncə qışın ortalarında dəhşətli hava fəlakəti baş verdi; Washington D.C aeroportundan qalxan təyyarə Potomac çayının üzərindən keçən körpüyə çırpıldı və öz sərnişinlərini buz kimi soyuq sulara qərq etdi. Xilas edici helikopter gəldikdə bütün diqqətlər özünü xilas etmək əvəzinə yellənən nərdivan-kəndiri təkrar-təkrar digər sərnişinlərə ötürən bir nəfərin üzərində cəmlənmişdi. Onlar bir daha geri döndükdə o artıq yox idi. Başqalarının yaşaya bilməsi üçün o, könüllü olaraq öz canını fəda etmişdi. Öz mənfəətini güdməyən bir əməl və xeyirxah bir iş gördüyü üçün bütün millətin gözü hörmət və pərəstiş ilə o adama tərəf yönəlmişdi. Bütün bunlara rağmən əgər ateist haqlıdırsa o halda həmin adam comərd deyildi, əksinə onun etdiyi ən axmaq bir şey idi. O, hamıdan qabaq nərdivana qalxmalı idi, əgər ehtiyac olsaydı digərlərini kənara itələməli idi ki, həyatda sağ qala bilsin. Amma tanımadığı insanların uğrunda ölməyə, qısa müddətlik mövcud olmaq üçün sahib olduğu yeganə şansını əldən verməyə gəldikdə isə nə üçün edilməlidir ki?! Bir ateistin nəzərində bunun üçün bir səbəb ola bilməz. Buna baxmayaraq digər insanlar kimi ateist də qeyri-iradi olaraq bu adamın fədakar hərəkətinə tərif və mədh ilə reaksiya verir. Əslində öz sistemi ilə uyğunluq içində yaşayan bir ateisti tapmaq ehtimal ki, heç bir zaman mümkün deyildir. Çünki mənəvi cavabdehlikdən və mənəvi dəyərlərdən məhrum olmuş kainat təsəvvür edilməsi mümkün olmayacaq qədər qorxuncdur.

## Həyatın amalı

Sonunda gəlin həyatdakı məqsəd probleminə baxaq. Həyatın bir amalının olduğunu inkar edən insanların çoxunun həyatda xoşbəxt yaşaması üçün yeganə yol ya müəyyən bir bir məqsəd uydurmaqdır, ya da öz rəylərini

məntiqi nəticələrinə gətirib çıxarmamaqdır. Birinci variant Sartre'ın misalında gördüyümüz kimi öz-özünü aldatmaqdır. Misal üçün ölüm probleminə baxın! Ernst Bloch'a[16] görə müasir insan üçün ölüm ilə üz-üzə yaşamağın yeganə yolu atalarının inandığı ölümsüzlük inancını şüuraltı olaraq borca götürməkdir, halbuki özünün bu inanca inanması üçün bir əsası yoxdur, çünki o, Allaha inanmır. Ölümsüzlük inancının qalıqlarını borc almaqla - Bloch yazır ki, - "**müasir insan onu dayanmadan bürüyən və şübhəsiz ki, sonunda onu udacaq olan uçurumu hiss etmir. Bu inanc qalıqları vasitəsi ilə o, məfhumu-zat hissini**[17] **qurtarmış olur. Onların vasitəsi ilə belə bir təəssürat ortaya çıxır ki, insan məhv olmur, sadəcə olaraq bir gün dünyanın bir daha ona görünməmək kimi bir ədabazlığı vardır.**" Bloch fikrini yekunlaşdırır: "**Bir qədər bayağı olan bu hünər, böyük məmnuniyyətlə ödünc alınmış kredit kartı ilə qidalanır. Bu hünər bir zamanlar təmin edilmiş ümidlər və dəstək sayəsində yaşayır.**"[x] Bu dəstəyə müasir insanın heç bir haqqı yoxdur, çünki o, Allahı inkar edir. Lakin yenə də mənalı bir həyat sürdürmək üçün o, iman sıçrayışları edərək yaşamaq üçün bir məna tapır.

İnsan və kainatın müəyyən bir səbəb və məqsəd olmadan, sadəcə bir təsadüf nəticəsində vücuda gəldiyini deyənlərin arasında bu ziddiyyətləri biz tez-tez görə bilirik. Hər bir şeyin kor təsadüfün məhsulu olduğu xaraktersiz bir kainatda yaşamaq mümkün olmadığı üçün bu insanlar fiziki proseslərin özlərinə xarakter və motivlər aid edirlər. Bu, əcaib ifadə tərzidir və aşağı mərtəbədən yuxarı mərtəbəyə edilən bir sıçrayışı təmsil edir. Misal üçün Francis Crick "*The Origin of The Genetic Code*" (Genetik Kodun Mənşəyi) adlı kitabının yarısından təbiət sözünü böyük "T" hərfi ilə yazmağa başlayır və kitabında bir çox yerdə "təbii seçmə" prosesini "ağıllı" və "nə edəcəyini fikirləşən" bir şey olmaqla vəsf

---

[16] Ernst Bloch (1885-1877) alman marksist filosofdur. Sosialist fikirləri ilə insan azadlıqları fikirlərini birləşdirən bir filosof olub. Ateist idi və Fransa, Çexiya, Amerika, İngiltərə kimi ölkələrdə mühacirət həyatı yaşayıb. Şərqi Almaniya Respublikasında bir müddət fəaliyyət göstərdikdən sonra siyasi səbəblərdən dərs verdiyi universitetdən uzaqlaşır və Qərbi Almaniyada yerləşir. Berlin divarı tikildikdən sonra bir daha Şərqi Almaniyaya qayıtmır və Tübingen şəhərində vəfat edir. (tərc.)

[17] Məfhumu-zat bir insanın özü barəsində sahib olduğu inanclar toplusudur; bura özünü nə qədər savadlı biri kimi dərk etməsi, özü haqqında bildiyi cinsəl kimlik, irqi mənsubiyyət qavramları daxildir. Buna biz "öz kimliyi" adını da verə bilərik. (tərc.)

edir.[18] İngilis astronom Fred Hoyle, kainatın özünə Allahın xüsusiyyətlərini aid edir. Carl Sagan'ın nəzərində həmişə böyük hərflərlə yazdığı "Kosmos" Allahı əvəz edici rol oynayır. Bütün bu insanlar Allaha inanmadıqlarını açıq etiraf etsələr də buna rağmən Allahı əvəz edən bir obrazı gizlin şəkildə arxa qapıdan içəri alırlar, çünki hər bir şeyin xaraktersiz, iradəsiz güclərin təsadüfü məhsulu olan bir kainatda yaşamağa dözə bilməzlər.

Fikirləri məntiqi nəticələrinə məcbur etdikdə həmin fikir sahiblərinin o fikirlərə necə xəyanət etdiklərini görmək özü də maraqlıdır. Misal üçün bəzi feministlər Freud'un seksual psixologiyasına qarşı etiraz tufanı qopardıblar, çünki mövqeyi çox şovinistdir və qadınların dəyərini alçaldır. Bəzi psixoloqlar onların istəyinə tabe olaraq öz nəzəriyyələrini yenidən işləyiblər. Bax bu tam bir ziddiyyətdir. Əgər Freud'un psixoloji nəzəriyyəsi həqiqətən doğrudursa bunun qadınları alçaltması önəmli olmamalıdır. Sən haqqın səni hara götürdüyünü bəyənmədiyin üçün onu dəyişə bilməzsən. Lakin başqa insanların alçaldıldığı bir dünyada ziddiyyətsiz şəkildə və xoşbəxtcəsinə yaşamaq mümkün deyildir. Amma əgər Allah mövcud deyilsə heç kimin dəyəri olmamalıdır.[19] Yalnız Allahın mövcudluğuna inanmaqla qadınların haqlarını ziddiyyətsiz şəkildə müdafiə etmək mümkündür. Çünki əgər Allah mövcud deyilsə o halda (Darvin nəzəriyyəsindəki) təbii seçim erkəklərin daha dominant və daha aqressiv olmağını tələb edir. Bu halda qadınların haqları dişi keçinin və ya toyuqların haqlarından artıq olmayacaq. Təbiətdə nə necə baş verirsə hər bir halda doğru olacaq. Amma belə bir dünya görüşü ilə kim həyatda yaşaya bilər?![20] Görünür ki, məntiqi nəticələrinə məcbur edildikdə öz

---

[18] Sovet dövründəki ateist akademiklərin də kitablarda "Ana Təbiət" sözünü işlətməkləri bunun bariz bir misalıdır. Allahı inkar etdikləri halda material dünyaya bir xarakter, bir iradə, bir kimlik nisbət edərək bununla Allahı əvəz edəcəklərinə inanırlar. Əslində isə onların bu etdikləri bir ziddiyyətdir, özlərini aldadaraq yaşamaq cəhdidir. (tərc.)

[19] Çünki Allaha inanmadıqda insanlar sadəcə olaraq kimyəvi maddələrdən ibarət bir varlığa çevrilir, öz iradəsində şəkk edən ruhsuz bir varlığa çevrilir. Bu baxımdan insan ilə heyvan arasında bir fərq qalmır, sudakı balıq ilə, mağaradakı yarasa ilə insan arasında bir fərq qalmır. (tərc.)

[20] Hətta neo-ateistlərin ən görkəmli nümayəndəsi, darvinizmin çempionu Richard Dawkins darvinist prinsiplərlə çalışan bir cəmiyyətdə yaşamaq istəmədiyini gizlətmədən ifadə edir. O deyir: "Bizim ehtiyac duyduğumuz həqiqi mənada anti-darvinist cəmiyyətdir. O mənada ki, güclülərin zəifləri əzdiyi, hətta öldürdüyü bir cəmiyyətdə yaşamaq istəmirik. Biz - ən azından – belə bir cəmiyyətdə yaşamaq istəmirik. Mən xəstələrə qayğı göstərdiyimiz, zəiflərə qayğı

nəzəriyyələrinə xəyanət edən froydçu psixoloqlar[21] belə həyatda yaşa bilmirlər.

Yaxud da B. F. Skinner[22] kimi birinin sosioloji *biheviorizmini* (behaviorism)[23] götür! Belə bir görüş George Orwell'in "1984" kitabında canlandırdığı cəmiyyət formasına gətirib çıxarır ki, belə bir cəmiyyətdə hökumət hər kəsin fikirlərini kontrol edir və onları proqramlaşdırır. Əgər Skinner'in nəzəriyyələrini doğrudursa Skinner'in siçan qutusunda yeməklə və elektrik şokla tovlanaraq labirintin içində qaçırdılan siçanlarla davranıldığı kimi insanlarla da davranmağa heç bir etiraz edilə bilməz. Skinner'ə görə bizim əməllərimizin hamısı onsuz da müəyyən edilib. Əgər Allah mövcud deyilsə bu cür proqramlaşdırmaya qarşı heç bir mənəvi etiraz edilə bilməz, çünki insan keyfyyət baxımından siçandan fərqlənmir, beləki hər ikisi də maddə, vaxt və şans yığımıdır. Amma yenə də belə qeyri-bəşəri bir dünya görüşü ilə kim yaşaya bilər axı?!

Yaxud da sonunda Francis Crick kimi birinin *bioloji determinizmini*[24] götür. Buradan çıxan məntiqi nəticə bu olur ki, insan da istənilən laboratoriya nümunəsi kimidir. Dachau kimi düşərgələrdə insanlar üzərində tibbi eksperimentlər aparmaq üçün faşistlərin dustaqlardan istifadə etdiklərini öyrəndikdə bütün dünya dəhşətə gəlmişdi. Amma niyə də olmasın? Əgər Allah mövcud deyilsə insanları hind donuzu kimi istifadə etməyə qarşı bir etiraz ola bilməz. Bu görüşün məqsədi əhalinin idarəsidir ki, orada güclülərə yer vermək üçün zəif və lazımsız insanlar öldürülür. Belə bir dünya görüşünə qarşı ziddiyyətə düşmədən etiraz

---

göstərdiyimiz, məzlumlara qayğı göstərdiyimiz bir cəmiyyətdə yaşamaq istəyirəm və bu, çox anti-darvinist bir cəmiyyətdir." (tərc.)

[21] Froydçu psixoloqlar ilə məşhur alman psixoloq, nevroloq, psixoanalitikanın banisi sayılan Sigmund Freud'un məktəbini davam edən psixoloqlar qəsd olunur.

[22] Burrhus Frederic Skinner (1904-1990) amerikalı psixoloq, biheviorist, sosial filosofdur. Skinner insanın azad seçimə sahib olmasını sadəcə bir illüziya hesab edirdi, ona görə insanın hər bir addımı daha öncə atdığı addımlardan asılıdır.

[23] Biheviorizm cərəyanı insanın davranışını anlamağa çalışan sistematic bir yanaşmadır. Bu nəzəriyyəyə əsasən insanın davranışları ya reflekslərdən ibarədir, ya da fərdin keçmişində etdiyi əməllərin nəticələrindən ibarətdir. Əgər bir insanın etdiyi əməl pis bir aqibətlə nəticələnirsə insan bu əməli bir daha etməyəcək, əgər yaxşı aqibətlə nəticələnəcəksə o zaman bu əməlini təkrarlayacaq.

[24] Bioloji determinizmə görə insanların davranışlarını kontrol edən onların genləri və bir qədər psixoloji komponentlərdir.

etmək yalnız Allah mövcud olduqda mümkündür. Yalnız Allah mövcud olduqda həyatın bir məqsədi və mənası ola bilər.

Müasir insanın dilemması buna görə də həqiqi mənada qorxuncdur. Allahın mövcud olduğunu, həyatın dəyər və məqsədindəki obyektivliyi inkar etdiyi müddətdə post-modern insan da bu dilemmadan azad ola bilməyəcək. Əlbəttə ki, məhz modernizmin qaçınılmaz bir halda absurdluq və ümidsizlik içində axmağından agah olmaq post-modernizmin iztirabını əmələ gətirir. Bir baxımdan post-modernizm sadəcə olaraq müasirliyin iflas etməyindən agah olmaqdır. Ateist dünya görüşü xoşbəxt və ziddiyyətsiz həyatı ayaqda saxlamaq üçün heç cür uyğun deyildir. Həyatın yekun olaraq mənasız, dəyərsiz və məqsədsiz olduğunu qəbul edərək ziddiyyətsiz və xoşbəxt bir həyat sürmək insan üçün mümkün deyildir. Ateist dünya görüşü ilə ziddiyyətsiz yaşamağa çalışsaq özümüzü dərin bir bədbəxtçilik içində tapacağıq. Amma bununla belə xoşbəxt yaşamağı bacarsaq bunu yalnız dünya görüşümüzə yalan qatmaqla edə biləcəyik.

Bu dilemma ilə üzləşdikdə bundan qurtulmaq üçün insan acınacaqlı şəkildə çabalayır. 1991-ci ildə Elmin İnkişafı üçün Amerikan Akademiyasına qeyri-adi müraciətində müasir insanın xoşagəlməyən vəziyyəti ilə üzləşən Professor L. D. Rue "nəcib yalan" vasitəsi ilə özümüzün və kainatın hələ də bir dəyərinin olduğunu düşünməklə özümüzü aldatmağımızı cəsarətlə müdafiə edirdi.[xi] "Son iki əsrdən öyrənilən dərs budur ki, intellektual və mənəvi relyativizm[25] ciddi mənada həqiqətdir" iddiasını edərək Professor Rue belə bir idrakın nəticələri üzərində götür-qoy edir və onun nəzərində bu idrakın nəticələri budur ki, şəxsi kamillik axtarışı ilə *sosial koherens[26]* axtarışı bir-birindən asılılığını itirir. Çünki relyativist dünya görüşündə şəxsi

---

[25] Relyativizm fəlsəfi bir görüşdür və bu görüşün nümayəndələrinə görə hər bir şey nisbidir, mütləq həqiqət yoxdur, hər bir kəs öz nəzərində haqlıdır. Bu, bir qədər Nietzsche'nin perspektivizm fikrinə yaxındır.

[26] Sosial Koherens və ya Qrup Koherensi fikri sosiologiyada bir qrupu, cəmiyyəti təşkil edən fərdlərin bir-biri ilə sıx bağlı olmasını təsvir edir. Bu təsəvvürə görə fərdlərin xoşbəxtliyi, onların pozitiv əhval-ruhiyyəsi sadəcə onun özündə yox, onun ətrafını bürüyən cəmiyyətdə də mövcuddur. Real həyatda bunun misalı özünü kədərli hiss edən insanın düşdüyü məclisdəki pozitiv enerjidən təsirlənərək xoş hislərə bürünməsidir. Futbol komandalarının yerli stadionda oynadıqda daha rahat qazanmasının izahı sosial koherens ilə bağlıdır, tribunaların verdiyi dəstək komandanın əzmini gücləndirir, effektivliyini artırır.

təkmilləşmə axtarışı kökündən şəxsiləşmiş olur: yəni hər bir kəs ayrılıqda öz dəyərlərini və həyat mənasını müəyyən edir.

*Sosial koherensə* önəm vermədən şəxsi kamilliyin uğrunda mübarizənin verildiyi “dəlixana seçimindən” və şəxsi inkişafın məhv edilməsi bahasına *sosial koherensin* zorla tətbiq edildiyi “totalitar seçimdən” qurtulmaq istəyiriksə eqoist maraqlardan ötədə yaşamağa - beləliklə də *sosial koherensə* nail olmağa - bizi ilhamlandıracaq bəzi “Nəcib Yalanları” qəbul etməkdən başqa çarəmiz yoxdur. Nəcib Yalan “o yalandır ki, şəxsi maraqlardan ötəyə, eqomuzdan ötəyə, ailə, millət və irqdən ötəyə bizi vadar edir, bizi aldadır.” Bu bir yalandır, çünki bizə kainatın mənəvi dəyərlərdə dəmləndiyini (hansı ki, böyük bir uydurmadır) deyir, çünki universal həqiqəti bildiyini iddia edir (halbuki öz ideologiyalarına görə belə bir şey yoxdur) və çünki bu yalan mənə öz şəxsi mənfəətim üçün yaşamamağı öyrədir (ki, bunun batil olması aşkardır). “Lakin bu cür yalanlar olmazsa biz yaşaya bilmərik.”

Bu, müasir insanın üzərində oxunulmuş dəhşətli bir hökmdür. Sağ qalmaq üçün özünü aldatmağa məcburdur. Lakin hətta “nəcib yalan” alternativi son mənzilində işə yaramır. Xoşbəxt olmaq üçün insan, həyatın obyektiv mənası, dəyəri və məqsədi olduğuna inanmalıdır. Amma ateizmə və relyativizmə inandığı müddətdə insan necə bu nəcib yalanlara inana bilər?! Nəcib yalanın zəruriliyindən nə qədər əminsənsə ona inanmaq bacarığın bir o qədər zəifləyir. Saxta dərman kimi “nəcib yalan” yalnız onun haqq olduğuna inanan kəslər üzərində işə yarayır. Ancaq onun qondarma olduğunu idrak etdiyimizdə o yalanlar bizim üzərimizdə təsirini itirir. Beləliklə də istehzayana olan budur ki, insanın bu çıxılmaz vəziyyətini görüb anlayan kəslər üçün “nəcib yalan” o çıxılmaz vəziyyəti həll etmək qabiliyyətini itirir.

Buna görə də bu “nəcib yalan” alternativi ən yaxşı halda, nəcib yalanı daimiləşdirməklə insan kütlələrini öz xeyirləri üçün aldadan *İlluminati* elitasının idarə etdiyi bir cəmiyyətə gətirib çıxara bilər. Amma içimizdə bu barədə maariflənmiş kəslər nə üçün bu fırıldaqda kütlələrə tabe olmalıdır ki?! Nə üçün qondarma bir şey üçün öz şəxsi maraqlarımızı qurban verməliyik?![27] Əgər son iki əsrdə öyrənilmiş ən böyük dərs

[27] Yəni əgər ateistlər heç bir mənəvi dəyərin haqq olmadığına, bunların hamısının subyektiv olduğuna inanırlarsa o zaman nə üçün öz şəxsi mənfəətlərini qurban verərək cəmiyyətin

mənəvi və intellektual relyativizmdirsə o halda nə üçün özümüzü axmaq yerinə qoyuruq ki, guya bu "haqqı" bilmirik və əvəzində yalan içində yaşayırıq?! Əgər bir kimsə - "sosial koherens uğrunda" - cavabını versə bir başqası haqlı olaraq soruşa bilər ki, nə üçün mən *sosial koherens* üçün öz şəxsi mənfəətlərimi qurban verməliyəm axı?! Burada relyativizmin verə biləcəyi yeganə cavab budur ki, *sosial koherens* həm də mənim şəxsi xeyrim üçündür. Ancaq bu cavabın problemi budur ki, şəxsi mənfəət ilə sürünün mənfəəti hər zaman üst-üstə düşmür. Üstəlik *sosial koherens* əgər məni öz şəxsi mənfəətim üçün qayğılandırırsa o zaman "totalitar seçim" hər zaman mənim üçün açıqdır; "nəcib yalanı" unutmaq və kütlənin şəxsi təkmilləşməsi imkanlarını qurban verməklə *sosial koherensi*, həmçinin öz şəxsi mənfəətimi təmin etmək. Heç bir şübhə yoxdur ki, Rue bu seçimi çox çirkin hesab edəcək. Sürtülüb yara edilmiş yer də məhz buradadır. Rue'nun dilemması budur ki, o çox aydın br şəkildə həm *sosial koherensə*, həm də fərdlərin kamilləşməsinə onların özləri üçün dəyər verir; başqa sözlə desək onlar artıq obyektiv dəyərlər olurlar, halbuki onun öz fəlsəfəsinə görə obyektiv dəyərlər mövcud deyildir. O artıq "yuxarı mərtəbəyə" sıçrayış edib. Beləliklə də "Nəcib Yalan" seçimi inkar etdiyini təsdiqləmiş olur və bununla da özü özünü rədd etmiş olur.

xeyri üçün çalışmalıdırlar? Əgər mənim başqalarının hesabına varlanmaq, güclənmək və bir dəfə yaşaya biləcəyim həyatdan tam həzz almaq imkanım varsa niyə başqa insanların da marağını düşünərək öz imkanlarımı qurban verməliyəm?

[i] Kai Nielsen, “Why Should I Be Moral?” American Philosophical Quarterly 21 (1984):90
[ii] Richard Taylor, “Ethics, Faith and Reason” (Englewood Cliffs, NJ: Prentice Hall, 1985), 90, 84
[iii] H.G. Wells, ”The Time Machine” (New York: Berkeley, 1957), chap. 11
[iv] W.E. Hocking, ”Types of Philosophy” (New York, Scribner’s, 1959), 27
[v] Friedrich Nietzsche, “The Gay Science”, in The Portable Nietzsche, ed. and trans. W. Kaufmann (New York: Viking, 1954), 95
[vi] Bertrand Russell, ”A Free Man’s Worship”, in Why I Am Not a Christian, ed. P. Edwards (New York: Simon & Schuster, 1957), 107
[vii] Bertrand Russell, Letter to the Observer, 6 October, 1957
[viii] Jean-Paul Sartre, “Portrait of the Antisemite”, in Existentialism from Dostoyevsky to Sartre, rev. ed., Walter Kaufmann (New York: New Meridian Library, 1975), p.330
[ix] Richard Wurmbrand, Tortured for Christ (London: Hodder & Stoughton, 1967), 34
[x] Ernst Bloch, Das Prinzip Hoffnung, 2d ed., 2vols. (Frankfurt am Main: Suhrkamp Verlag, 1959), 2:360-1.
[xi] Loyal D. Rue, “The Saving Grace of Noble Lies”, adress to the American Academy for the Advancement of Science, February, 1991



William Lane Craig amerikalı analitik filosof və xristian apologetdir. Talbot universitetində fəlsəfə və teologiya üzrə mühazirələr verən Craig fəlsəfə dünyasında ən çox kəlam-kosmoloji arqument haqqında yazdığı yazıları ilə məşhurdur. Allahın varlığı, mənəviyyat, şər və xeyir kimi məsələlərlə bağlı dünyanın ən məşhur ateist filosofları və naturalistləri ilə debatlarda iştirak edib.